UOT indeksi -33

# İQTİSADİYYATIN QEYRİ-NEFT SEKTORUNUN İNKİŞAFI PROBLEMLƏRİ (AQRAR SAHƏNİN TİMSALINDA)

**R.M.QULUYEV**
**Azərbaycan Dövlət Iqtisad Universiteti [UNEC]**

*Ölkə iqtisadiyyatının davamlı inkişafı üçün qeyri-neft sektorunun inkişafı zəruridir. Burada aqrar sektor mühüm əhəmiyyət kəsb edir. Kənd təsərrüfatı məhsulları istehsalını stimullaşdırmaq iqtisadi inkişafa təkan verəcək. Kənd təsərrüfatı məhsullarının xarici bazarlara çıxarılması ölkəmizə əlavə valyuta daxilolmalarını artıracaq. Beləliklə, minlərlə insanın məşğulluq məsələləri həllini tapacaq. Məqalədə bu istiqamətdə təhlillər aparılmışdır.*

***Açar sözlər:*** *qeyri-neft sektoru, iqtisadi inkişaf, sosial rifah, ixrac, kənd təsərrüfatı*

Hər bir ölkə öz iqtisadiyyatının dayanıqlı olması üçün təssərrüfatının müxtəlif sahələrini kompleks formada inkişaf etdirilməsini planlaşdırır və proqnozlaşdırır. Bu baxımdan bəzi dünya ölkələri öz iqtisadi inkişafını mono istiqamətdə, bir profilli yönümdə qurduğu üçün belə iqtisadiyyatlar davamlı ola bilmir və baş verən proseslərin mənfi təsirindən qorunma qabiliyyəti zəif olur. Adətən belə ölkələr neft və qaz təbii resursları ilə zəngin olan ölkələrdir.

Azərbaycan tarixən neft və qaz ehtiyatları ilə zəngin olan bir ölkə kimi tanınıb, ”Odlar yurdu” Azərbaycan öz təbii ehtiyatları ilə həmişə diqqət mərkəzində olmuşdur. Son zamanlar siyasi-iqtisadi, iqtisadi –sosial səbəblərdən neftin qiymətində baş verən volatillik ölkəmizin iqtisadi inkişafı şaxələndirməyi, iqtisadiyyatın diversifikasiyasını tələb edir. Çünki dayanıqlı iqtisadi inkişafın təmin edilməsi üçün iqtisadiyyat həm neft və qaz sektoru, həm də qeyri-neft sektoru baxımından inkişaf etdirilməlidir.Azərbaycan öz iqtisadiyyatının perspektiv inkişafı üçün bir sıra addımlar atmaqdadır.Belə ki, dövlət səviyyəsində qəbul edilmiş bir sıra qərarlar sayəsində iqtisadiyyatın davamlı inkişafı üçün perspektivlər mövcuddur. Azərbaycan Respublikasl Prezidentinin 2016-cı il 6 dekabr tarixli 1138 nömrəli Fərmanı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi”mühüm əhəmiyyət kəsb edir.Burada iqtisadiyyatın müxtəlif sahələrinin, qeyri-neft sektorunun inkişaf etdirilməsi üzrə konkret proqnozlar və icra olunmalı bəndlər öz əksini tapıb.

Azərbaycan öz iqtisadiyyatını davamlı inkişaf etdirmək üçün qeyri-neft sektorunun sürətli inkişafını stimullaşdırır. Burada əsas diqqət aqrar sahənin inkişaf etdirilməsinə yönəldilmişdir. “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi”ndə kənd təsərrüfatının və aqrar sahənin inkişafı xüsusi diqqətdə saxlanılmış, ayrıca olaraq, Azərbaycan Respublikasının kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi hazırlanmışdır. Azərbaycan Respublikasının kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsində bir sıra müddəalar vardır ki, onlar konkret olaraq perspektiv inkişaf üçün əsas hədəflərdir. Ərzaq təhlükəsizliyinin dayanıqlılığının təmin edilməsi, əhalinin bütün təbəqələrinin etibarlı ərzaq təminatına nail olunması mexanizminin formalaşdırılması, həm daxili, hə də xarici bazarlarda rəqabətqabiliyyətli kənd təsərrüfatı və emal sənayesi məhsulları üzrə istehsalı potensialları, aqrobiznesin inkişafına dəstək infrastrukturunun formalaşdırılması, kənd təsərrüfatı üzrə maliyyələşmə mexanizmlərinin təkmilləşdirilməsi, aqrar sahəyə investisiya qoyuluşlarının təşviq edilməsi, gübrə və bitki mühafizə vasitələri ilə təminatın yaxşılaşdırılması, kənd təsərrüfatı məhsulları istehsalçılarının baytarlıq və fitosanitar xidmətləri ilə təminatının təkmilləşdirilməsi, aqrar təhsildə keyfiyyətcə yeni inkişaf mərhələsinə keçidın təmin edilməsi, kənd təsərrüfatı torpaqlarından və su ehtiyatlarından dayanıqlı istifadəmexanizmlərinin təkmilləşdirilməsi və digər məsələlərin həlli qarşıda dayanan vacib məsəslələrdəndir. Aqrar sahənin inkişaf etdirilməsi ölkəmizdə qeyri-neft sektorunun tərəqqisini intensivləşdirəcək ki, bu da iqtisadiyyatın dayanıqlı inkişaf etdirilməsinə təkan verəcək.Ölkəmizdə aqrar sektorun ixrac potensialı artır.

Aqrar sektorda həyata keçirilən islahatlar miqyasına və nəticəsinə görə uğurludur. Xüsusilə son dövrlər məhsul istehsalı artmış, bu isə öz növbəsində xarici bazarlara məhsul çıxarılmasına şərait yaratmışdır. Məhsul istehsalının artımı ölkə daxili tələbatın təmin olunmasın, həm də plkə xarici bazarlara çıxışa imkan verir ki, nəticədə büdcəyə daxilolmada əlavələr formalaşır.

Regionların 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramının icrasının dördüncü ilinin yekunlarına həsr olunan konfransda cənab Prezident İlham Əliyev tərəfindən müxtəlif sahələr üzrə məhsul istehsalının artırılmasının zəruriliyi qeyd edilib: ”Meyvə istehsalı bizdə artır və artacaq. Xurma ixracı keçən il 90 milyon səviyyəsində olmuşdur.2016-2017-ci illərdə 800 hektarda yeni xurma bağları salınmışdır. Ona görə də xurma, nar istehsalı artacaq və artmalıdır.İntensiv bağçılığa çox böyük diqqət göstərilir. Alma bağları da sürətlə genişlənir və bu da ixrac üçün çox önəmli sahəyə çevirilib” .Ümumiyyətlə aparılan uğurlu siyasət sayəsində məhsul ixracında aqrar sektorun payı sürətlə artmaqdadır.Statistikaya nəzər salaq;fındıq ixracının dəyəri 2016-cı ildə 105, 2017-ci ildə 114 milyon, xurma 2016-cı ildə 69, 2017-ci ildə 91 milyon, alma 2016-cı ildə 23, 2017-ci ildə isə 31 milyon dollar olmuşdur. (1.1)

Yuxarıda qeyd olunanları nəzərə alsaq demək olar ki, yaxın gələcəkdə bu məhsullar üzrə həm daxili bazar, həm də xarici bazarlarda tələbata uyğun məhsullarla təminat həll olunacaq. Ən vacib məqam ondan ibarətdir ki, xarici bazarlara məhsulların çıxarılması məhsul istehsalçılarından daha keyfiyyətli və təmiz malların istehsalını həyata keçirməyə maraq yaradır. Daha mütərəqqi istehsal metodlarından istifadə etməklə keyfiyyətli və zəruri tələbat məhsullarının istehsalını reallaşdırmaq mümkündür. Aqrar sahədə qəbul edilmiş proqramlar və həyata keçirilən tədbirlər kənd təsərrüfatı istehsalçılarının istehsal prosesini səmərəli formada realizə etməyə imkan verir. Kənd təsərrüfatında fəaliyyət göstərən sahibkarlıq subyektlərinə dövlət tərəfindən bir sıra imtiyazlar verilir, güzəştlər tətbiq edilir.Torpaqların əkib becərilməsinə görə yanacaq və sürkü materialları ilə təminatda, torpaqlarda təsərrüfat işləri zamanı zərərvericilərəqarşı və məhsuldarlığın artırılmasına nail olmaq üçün mineral gübrələrlə təminat diqqət mərkəzində saxlanılmışdır. Burada əsas məqsəd əlbətdə aqrar sahənin inkişafını stimullaşdırmaq, kənd təsərrüfatında təsərrüfat sübyektlərinin rahat fəaliyyətinə münbit şərait yaratmaq və beləliklə məhhsul bollunu təmin etməklə ölkədə ərzaq təhlükəsizliyini təmin etmək, iqtisadiyyatın qeyri – neft sektoru sahələrini inkişaf etdirməklə neft və qaz sahələrindən asılılığı minimuma endirməkdir. Bununlada iqtisadiyyatımızı dünyada baş verən dəyişikliklərdən sığortalamaq, dəyə bilən hər hansı neqativ təsirlərdən qorumaq ən başlıca vəzifələrdəndir. Ölkəmizdə aqrar sektorda mühüm sahələrdən biri dəs zeytunçuluğun inkişaf etdirilməsidir. 300 hektar yeni zeytun bağı salınıb yaxın illərdə 3 min hektar yeni zeytun bağları salınacaq.Ölkəmizdə həm də yeni zeytun emalı fabriki tikiləcək.burada zeytundan müxtəlif çeşiddə məhsullar hazırlanacq. Keyfiyyətli və müalicəvi xüsusiyyəti olan zeytundan hazırlanan məhsullar həm daxili, həm də xarici bazarlarda satışa çıxarılacaq.Bu sahədə də olduqca perspektivli və səmərəli sahələrdəndir.Gösərilənlərlə yanaşı respublikamızda digər ənənəvi kən təsərrüfatı sahələrinin inkişaf etdirilməsi üçün geniş inkanlar yaradılmışdır.Çayçılığın, çəltik və sitrus meyvəçiliyinin inkişaf etdirilməsi üçün böyük potensilal malikik.

12 sentyabr 2017-ci il tarixli “Azərbaycan respublikasında sitrus meyvələri, çay və çəltik istehsalının inkişafı ilə bağlı əlavə tədbirlər haqqında” dövlət başçımız cənab İlham Əliyevin imzaladığı sərəncam mühüm əhəmiyyət kəsb edir.

Həmin sənəddə deyilir:”Aqrolizinq “ Açıq Səhmdar Cəmiyyəti tərəfindən sitrus meyvələri, çay və çəltik istehsalçılarına zəruri kənd təsərrüfatı texnikasının, texnoloji avadnlıqların lizinq yolu ilə icarəyə verilməsini və ya satılmasını, onlara texniki servis xidmətlərinin göstərilməsini, habelə dövlət büdcəsi hesabına alınan prestisidlərin, mineral gübrələrin, tinglərin və toxunların güzəştli şərtlərlə satılması təmin edilsin.yerli və xarici çəltik sortlarının sınağının təşkili, seleksiya nailiyyətlərinin Azərbaycan respublikası ərazisində kənd təsərrüfatı məhsulları istehsalı üçün istifadəsinə icazə verilmiş və mühafizə olunan seleksiya nailiyyətlərinin dövlət reyesterinə daxil edilməsini təmin etsin”. (1.6) Buradan aydın görünür ki, dövlət kənd təsərrüfatında bu istiqamətdə istehsalı stimullaşdırmaq üçün qərar qəbul edib. Azərbaycanda Lənkəran-Astara, Zaqatala bölgəsində çayçılığın qədim tarixi vardır.Keçmiş SSRİ-də Azərbaycan çaya olan tələbatın 8-10 faizini ödəmişdir. Həmin vaxtlarda ölkəmizdə fəaliyyət göstərən çay fabriklərindən azı 2-si Bakıda, çox hissəsi isə cənub bölgəsinə yerləşmişdir.

Keçmiş SSRİ-nin dağılmasından sonra çayçılıq da tənəzzülə uğramağa başladı. Bir maraqlı fakt ondan ibarətdir ki, 1990-cı ildə 30.7 ton çay istehsal olunduğu halda, 1995-ci ildə həmin rəqəm 9.41 tona enmişdir.(1.6) Təkcə bu rəqəm göstəriciləri əyani sübut edr ki, çayçılıq sahəsi də kifayət qədər inkişafdan geri qalmışdır. Statistik göstəricilərə nəzər salsaq görərik ki, 2017-ci ldə ölkəmizə 12 min 600 ton çay idxal olunub və buna görə 45 milyon dollar vəsait sərf olunmuşdur. 2016-cı ildə isə 1100 ton çay icrac edilib və ölkəmizə 6 milyon 100 min dollar məbləğində valyita daxil olmuşdir.(1.6) Bu rəqəmlərə nəzər yetirdikdə aydın olur ki, idxal ixracdan çox olmuşdur. Bu isə əlavə valyutanın ölkədən kənara çıxmasına səbəb olmuşdur. Bu kimi halların aradan qaldırılması üçün, iqtisadiyyatın qeyri-neft sektoru olan aqrar sahənin inkişafına daha

həssas yanaşılmalıdır. Çayçılığın inkişaf etdirilməsi üçün əlverişli iqtisadi mühit yaradılmalıdır. Dövlət-özəl bölmə birlikəd fəaliyyət göstərməlidir. Bu sahəyə daxili və xarivi investisiyaların cəlb olunmasını sürətləndirmək zəruridir. Çay məhsullarının xarici bazarlara çıxarılması təşviq edilməlidir.Bunun üçün sahibkarlara gömrük-vergi məsələlərində münasib güzəştlər tətbiq edilməlidir ki, bu sahədə istehsal stimullaşdırılsın. Bu sahədə mütərəqqi istehsal texnikalarından istifadənin tətbiq edilməsi və yeni məhsuldar çay sortlarının və tinglərin alınması, sahibkarlara güzəştli şərtlərlə maliyyə vəsaitlərinin ayrılması, hətta bəzi hallarda vergidən qismən azadolmaların tətbiq edilməsi təqdirəlayiq haldır. Keçmiş SSRİ-i süquta uğrayandan sonra digər sahələrdə durğunluq yarandığı kimi bu sahələrdə də çay plantasiyaları tədricən məhv olmağa başladı. Lakin sonralar diqqət artırılsa da, tam səmərə verə bilmədi. Hal-hazırda bu istiqamətdə ciddi işlər görülür. Limon, mandarin, portağal, kivi və s . kimi bitkilərin becərilməsi üçün münbit şərait var. Azərbaycanın əlverişli coğrafi mövqeyi, iqlim şəraiti sitrus meyvəçiliyinin inkişaf etdirilməsinə geniş imkanlar açır. Azərbaycanın əlverişli iqlim şəraitinin mövcudluğu bölgələrdə müxtəlif növ təsərrüfat sahələrinin bölgə üzrə inkişaf etdirilməsini tələb edir .Ona görə də hər bir bitki növü üzrə elmi tədqiqat işləri də lazımı formada həyata keçirilməlidir. Həmin bitki növlərinin konkret bölgələr üzrə əkib becərilməsi və son nəticədə daha keyfiyyətli məhsul əldə etməyə, məhsuldarlığın yüksəlməsinə imkan yaradacaq.

Bununla yanaşı, ölkəmizdə iqtisadiyyatın davamlı inkişafının təmin olunası üçün kənd təsərrüfatında çəltikçiliyin inkişaf etdirilməsi də diqqətdə saxlanılmışdır. Belə ki, Azərbaycan Respublikası Prezidentinin 9 fevral 2018- ci il tarixli “Azərbaycan Respublikasında çəltikçiliyin inkişafına dair 2018-2025-ci illər üçün Dövlət proqramı”nın təsdiq edilməsi haqqında sərəncamı çəltikçiliyin inkişaf etdirilməsi, çəltik istehsalının təkmilləşdirilməsi, emal müəssisələrinin xammal təminatının yaxşılaşdırılması, kənd təsərrüfatına əhalinin məşğulluğunun və rifah halının yüksəldilməsinin təmin edilməsini nəzərdə tutur. Çəltikçiliyin inkişafına göstərilən diqqət bu sahədə məhsuldarlığın artırılmasına səbəb olacaq. Bu məhsula olan daxili və xarici bazarlarda tələbat ödəniləcəkdir. Ölkə iqtisadiyyatının davamlı inkişafının təmin olunması aktual məslələrdəndir. Burada məqsəd neft amilindən asılılığın azaldılması, digər sahələrin, həm sənaye sahələrinin, həm də aqrar sahələrin inkişafının labudlüyüdür. Dövlət qeyri-neft sektoru kimi aqrar sahənin inkişafına xüsusi diqqət yetirir.

Qeyri-neft sektorunda istehsalın təşviqi məqsədilə bəzi mallar idxal gömrük rüsumundan azad olunmuşdur. Nazirlər kabinetinin 2017-ci il 24 avqust tarixli 337 saylı qərarına əsasən, ”Azərbaycan Respublikasında idxal-ixrac əməliyyatları üzrə gömrük rüsumlarının dərəcələri haqqında” Azərbaycan Respublikası Nazirlər Kabinetinin 1998-ci il 22 aprel tarixli 91 saylı qərarında dəyişiklik edilmişdir. Nazirlər Kabinetinin sözügedən qərarı qeyri-neft sektorunun davamlı inkişafının təmin edilməsi, bu sahəyə dövlət dəstiyinin daha da gücləndirilməsi, yeni və müasir texnologiyaların təşviq edilməsi məqsədini daşıyır. Gömrük rüsumlarından azad edilən malların siyahısına Safqanlı cins iribuynuzlu diri heyvanlar, safqanlı cins diri qoyunlar, safqanlı cins diri keçilər, çəkisi 185 qramdan artıq olmayan ana və əcdad cinsi xətti ilə çoxaldılan ev toyuqlarının (Gallus domesticus) cücələrinin yumurtalayan növləri və digər növlər aid edilmişdir. Həmçinin toxumluq soya paxlaları, əkin üçün günəbaxan toxumu, qırmızıüçyarpaq yonca toxumu (Trifolium pretense L), yem çuğundurunun toxumu, gübrələr, kənd təsərrüfatında istifadə edilən insektisidlər, rodentisidlər, funqisidlər, herbisidlər, bitkilərin boy artımına qarşı və boyartımını tənzimləyən vasitələr (3808 94 yarımmövqeyində göstərilən dezinfeksiyaedici vasitələrdən başqa), kənd təsərrüfatı məhsulları üçün quruducular, süd separatorları, qida sənayesində istifadə edilən suyun filtrlənməsi və ya təmizlənməsi üçün avadanlıqlar və qurğular idxal gömrük rüsumundan azad edilmişdir. Bundan başqa kənd təsərrüfatı və bağçılıq üçün suvarma qurğuları, traktorlara qoşmaq və traktorlara yedəkləmək üçün nəzərdə tutulmuş toz tozlandırıcıları və səpələyiciləri, xüsusi olaraq kənd təsərrüfatında istifadə üçün nəzərdə tutulmuş səpələnən materiallar üçün pnevmatik qaldırıcılar və konveyrlər, xüsusi olaraq kənd təsərrüfatı traktorlarına qoşmaq üçün hazırlanmış yükləyici qurğular, kənd təsərrüfatı, bağçılıq, meşə təsərrüfatı maşınları, torpağın hazırlanması və işlənməsi üçün maşınlar (8432 80000 1 alt yarımmövqeyində göstərilən qazon və idman meydançaları üçün katoklar istisna olmaqla), kənd təsərrüfatı bitkilərinin yığılması və ya döyümlənməsi üçün maşınlar və ya mexanizmlər, pres çeşidləyici, küləş və samanı kiplərə bağlayan preslər də daxil olmaqla: otbiçənlər, yumurtaların, meyvələrin və ya digər kənd təsərrüfatı məhsullarının təmizlənməsi, çeşidlənməsi və ya kalibrlənməsi üçün maşınlar, sağıcı qurğu və aparatlar, südün emalı və təkrar emalı üçün avadanlılar da siyahıda yer alıb. (3.3)

Yuxarıda qeyd olunanlardan da aydın təsəvvür etmək olar ki, dövlət səviyyəsində aqrar sektorun inkişafı ilə bağlı kifayət qədər təkmilləşdirilmiş

hüquqi baza formalaşdırılır. Burada əsas məqsəd aqrar sektorun inkişafını intensivləşdirmək, daha qısa zaman kəsiyində yüksək məhsuldarlığa nail olmaq, kənd təsərrüfatı məhsullarının istehsalını artırmaq əsas götürülür. Aqrar sahənin inkişaf etdirilməsi üçün sahibkarlıq subyektlərinə bu kimi güzəştlərin edilməsi, kəndli fermerlərə daha çox məhsul istehsal etmələri üçün stimul yaradılması gələcəkdə bu sahənin daha da inkişafına təkan verəcək. Kənd təsərrüfatında çalışan təsərrüfat subyektlərinə güzəştli şərtlərlə və uzun müddətlərə kreditlərin verilməsi kənd təsərrüfatında istehsal prosesinin aktiv fazaya keçməsinə hesablanmışdır.Kənd təsərrüfatında istifadə olunan əkin-biçin vasitələrinin, bəzi qurğuların və digər avadanlıqların gömrük rüsumlarından azad edilməsi mühüm əhəmiyyət kəsb edir. Bu kənd təsərrüfatı işləri ilə məşğul olan təsərrüfat subyektlərinə arxayın və rahat formada öz fəaliyyətləri ilə məşğul olmaq imkanı yaradır, dövlət onlara bu istiqamətdə kifayət qədər dəstəyi göstərməyə çalışır. Gələcəkdə də bu sahənin inkişaf etdirilməsi üçün zəruri olan bütün proqramlar, qərarlar ugurla icra olunacaq. Çünki aqrar sahənin inkişafı qeyri-neft sektoru kimi iqtisdiyyatın davamlı və dayanıqlı inkişafının təminatıdır.

Biz ölkə iqtisadiyyatını dünyada baş verən sosial-siyasi, iqtisadi proseslərin neqativ təsirlərindən mühafizə etmək üçün iqtisadiyyatın digər, qeyri-neft sektoru sahələrinin inkişafını sürətləndirməliyik. Bu məqsədlə hüquqi baza təkmilləşdirilir, yeni, daha mütərəqqi qanunlar hazırlanır, qərarlar qəbul edilir.

**ƏDƏBİYYAT**

1. ”Azərbaycan “ rəsmi dövlət qəzeti, 20.02.2018-ci il tarixli buraxılışı. 2. Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi, Azərbaycan respublikasının prezidentinin 2016-cı il 6 dekabr tarixli Fərmanı. 3. “Azərbaycan “ rəsmi dövlət qəzeti, 30 avqust 2017-ci il tarixli buraxılışı

**Проблемы развития ненефтяного сектора экономики(на примере сельского хозяйства)**

**Р.М.Кулиев**

Развития ненефтяного сектора необходимо для устойчивое развитие экономики страны**.** Здесь аграрный сектор представляет важное значение. Стимулирования производства сельскохозяйственной продукции, придаст импульс экономического развитию. Поставок продукты сельского хозяйства на внешние рынки увеличит дополнительных валютные поступления в страну. Таким образом, вопросы занятости тысячи людей будут решены. В статье были проведены исследования в этом направлении.

***Ключевые слова:*** *ненефтяного сектор, экономического развития, социального благосостояния, экспорт, сельского хозяйства*

**Problems of development of the non-oil sector (in the example about agriculture)**

**R.M.Quliyev**

The development of non-oil sector is necessary for the sustainable development of the economy of our country. The agricultural sector is important here. Stimulation the production of agricultural products will give impetus to economi c development. Taking agricultural products to foreign markets will increase additional currency revenues of our country. Thus, thousands of people"s unemployment issues will find solution. İn the article is analysed about this direction.

***Key words:*** *Non-oil sector, economic development, social well-being, export, agriculture*